*Azərbaycan MEA Məhəmməd Füzuli adına Əlyazmalar İnstitutu Elmi Şurasının 22 sentyabr 2008-ci il tarixli 9 №-li iclasının qərarı ilə nəşr edilir.*

*Müqayisəli mətnin tərtibi, tərcümə, transfonoliterasiya, ön söz, izahlar və adlar göstəricisi:* **Əkrəm BAĞIROV** ***filologiya elmləri namizədi***

*Elmi redaktoru:* **Teymur KƏRİMLİ** ***AMEA-nın müxbir üzvü***

**Sadiq bəy Əfşar,** "Məcməül-Xəvas" (tərcümə, müqayisəli mətn) Bakı: «Elm», 2008. – 412 s.

ISBN 5-8066-1732-7

XVI-XVII əsrlər görkəmli Azərbaycan şairi, ədəbiyyatşünası və rəssamı Sadiq bəy Əfşarın "Məcməül-Xəvas" təzkirəsinin təqdim olunan nəşri əsərin Təbriz külliyyat nüsxəsindəki mətni əsas götürülməklə doktor Əbdür-Rəsul Xəyyampur tərəfindən h.1327-ci ildə Təbrizdə çap olunmuş mətn ilə müqayisə edilmiş və bütün əsas variant fərqləri göstərilməklə tərtib olunub hazırlanmışdır.

$Ə\ \frac{4603000000}{655(07)-2008}$

*Kompüter tərtibiçisi və korrektoru:* **Tural BAĞIRZADƏ**

© Ə.Bağırov, 2008
© AMEA M.Füzuli adına Əlyazmalar İnstitutu, 2008

## SADİQ BƏY ƏFŞAR VƏ ONUN TƏZKİRƏSİ

### *(Ön söz)*

Azərbaycan ədədi-estetik fikir tarixinin qaynaq simalarından və ən möhtəşəm şəxsiyyətlərindən biri də Sadiq bəy Əfşardır. Mənbələrdə Sadiq bəy Sadiqi və ya Sadiqi Kitabdar kimi də təqdim olunan bu insan hərtərəfli biliyə malik bir şəxs olmuş, özündən sonra Orta əsr müxtəlif elm sahələrindən xəbər verən sanballı əsərlər yadigar qoyub getmişdir. Lakin, təəssüf hissi ilə qeyd edilməlidir ki, bu günə qədər Sadiq bəy Əfşarın orta əsr rəssamlığının nəzəri və əməli problemlərindən bəhs edən 205 beytlik ***"Qanunüs-Süvər"*** mənzum risaləsinin 1971-ci ildə Bakıda nəşr edilmiş tərcüməsindən və Orta əsr Azərbaycan ədəbiyyatşünaslığının möhtəşəm abidələrindən olan ***"Məcməül-Xəvas"*** təzkirəsinin İran alimi, azərbaycanlı Doktor Əbdür-Rəsul Xəyyampur tərəfindən fars dilinə tərcümə edilərək hicri-şəmsi 1327 (m.1948)-ci ildə Təbrizdə orijinal türk mətni ilə birlikdə çap edilmiş və artıq əlyazma səviyyəsində nadir nüsxə sayıla bilən nəşrindən başqa geniş oxucu və tədqiqatçı kütləsinin müraciət edə biləcəyi başqa etibarlı bir mənbə, demək olar ki, yox dərəcəsindədir. Bu səbəbdən də Orta əsr tərkirə və tərkirəciləri və konkret olaraq Sadiq bəy Əfşar və onun ***"Məcməül-Xəvas"*** təzkirəsi haqqında söz deyən və danışan tədqiqatçılar böyük çətinliklərlə üzləşməli olmuş və hətta, bəzi hallarda ilkin mənbəyə müraciət edə bilmədiklərindən bir-birini təkrar edən səhvlərə belə yol vermişlər...

Sadiq bəy Əfşarın əsli, özünün də qeyd etdiyi kimi Xudabəndəli adı ilə tanınan türk-əfşar tayfalarından olmuşdur. Təbrizin Vərci məhəlləsində, varlı ailədə doğulmuş Sadiq bəy 20 yaşında ikən atasını itirmiş və ondan qalan mirasın ədalətsizcəsinə bölüşdürülməsindən narazı qalaraq doğulduğu diyarı tərk etmiş, dərviş həyatına üz tutmuş, qələndərlərə qoşulmuşdur. O, müəyyən fasilələrlə ömrünün bir hissəsini səfərlərdə keçirmiş, müxtəlif insanlarla görüşmüş, onların bilik və istedadlarından faydalanmış, özünə neçə-neçə dostlar qazanmışdır. Bütün bunlar haqqında o, bu səfərlərin məhsulu olan və elmi-ədəbi bir əsər kimi bu gün də maraqla oxunan və müraciət olunan ***"Məcməül-Xəvas"*** tərkirəsində yeri gəldikcə məlumat vermişdir.

Şair, təzkirəçi alim və rəssam Sadiq bəy Əfşarın həm də Orta əsr

muğam və təsniflərindən xəbər verən gözəl musiqi duyumu - anlayışı və hərtərəfli istedada malik bir şəxs kimi təbabət elminə yaxınlığı olmuşdur. Onun evində ***həcamət dəstgahı*** deyilən bir avadanlıq olmuş və təzkirəsində qeyd olunduğu kimi müasiri olduğu şair Bazili Savəcinin iki ağrıyan dişini özü bu ***dəstgahda*** çəkmişdir. O dövrün xəstəlikləri və təbabətin vəziyyəti haqqında yeri gəldikcə qısa, lakin professional söz deməyi bacarsa da Sadiq bəy Əfşar Azərbaycanın mədəniyyət tarixində bir ***saray kitabdarı*** kimi böyük şöhrətə və hörmətə malik olmuşdur. II Şah İsmayıl (şahlıq illəri h.984-985) dövründə saray kitabxanasına gələn şair-rəssam, Sultan Məhəmməd (şahlıq illəri h.985-996) dövründə kitabxana rəisliyinə qədər yüksəlmişdir. Şah Abbas (şahliq illəri h.996-1038) dövründə də bu mənsəbin sahibi olmuş Sadiqinin izzət və ehtiramı azalmamışdır. Elə bu səbəbdən də müəyyən bir müddətdən sonra (h.1007 – m.1599-1600) Şah Abbas tərəfindən bəzi səbəblərə görə saray kitabdarlığından uzaqlaşdırılan şair ömrünün sonuna qədər bu vəzifənin təqaüdünü almışdır.

Həyatının son illərini İsfahanda keçirən Sadiq bəy bir tərəfdən ***külliyyatının*** tərtibi ilə (h.1010 – m.1601-1602) məşğul olmuş, o biri tərəfdən də düçar olduğu xəstəliklərlə mübarizə aparmışdır.

Tədqiqatçıların istinad etdiyi mənbələrə əsasən 77 il ömür sürmüş şair-təzkirəçinin doğum tarixi h.940 (m.1533), ölüm tarixi isə h.1017 (m.1609-1610)-ci il kimi qəbul edilə bilər.

Sadiq bəy Əfşar bir şair kimi qələmini Orta əsrin bütün şer növlərində sınamaqla yanaşı həm türk, həm də fars dillərində epik və lirik, mənzum və mənsur əsərlər yaratmışdır. Sadiq bəy Əfşarın bu gün dünya kitab xəzinələrinin və muzeylərinin nadir inciləri sayılan ədəbi, elmi və rəsm əsərlərinin hər biri təkrarolunmaz bir sənət nümunəsi kimi olduqca dəyərli və qiymətli sayılsa da onun ən maraqlı və əvəzolunmaz əsərlərindən biri, ədəbiyyatşunaslar və azərbaycanşunaslar üçün, bəlkə də, birincisi, əlbəttə ki, ***"Məcməül-Xəvas"*** təzkirəsidir. Mir Əlisir Nəvainin ***"Məcalisün-Nəfais"*** adlı təzkirəsinin üslubunda, təxminən h.1007-1008 (m.1597-1598)-ci illərdə ciqatay türkcəsində yazılmış və Orta əsr Osmanlı torpaqlarından tutmuş bugünkü İran, Azərbaycan, Orta Asiya, Əfqanıstan, Pakistan və Hindistana qədər olan böyük bir ərazinin konkret bir zaman çərçivəsində (I Şah İsmayıl dövründən müəllifin həyatda olduğu günlərədək) ədəbi və ictimai-siyasi mühitini əhatə edən əsərin dünya kitabxanalarında müəllifin öz dövründən başlayaraq köçürülmüş müxtəlif nüsxələri saxlanmaqdadır.

Təzkirə, ***müqəddimə, 8 məcmə*** və ***xatimə***dən ibarətdir.

Əsər tədqiqatçıların gəldiyi ümumi nəticəyə görə, qeyd olunduğu kimi, Nəvainin uslubuna və təzkirəçilik ənənəsinə uyğun bir şəkildə yaradılsa da öz orijinallığı və elmi-bədii dəyəri ilə bu janrda yazılmış Orta əsr təzkirələri içərisində xüsusi çəkiyə malikdir.

Əsərin ***müqəddimə***sində Sadiq bəy Əfşar özündən əvvəl təzkirə janrında əsərlər yaratmış Orta əsr müəlliflərinin adlarını hörmətlə yad edərək bu silsiləyə özünün də bir töhfə kimi ***"Məcməül-Xəvas"*** adlı bir təzkirə əlavə etdiyini və əsəri I Şah Abbas dövründə bitirdiyini qeyd edir.

***Birinci məcmə***də öz dövrünün ***şairlik istedadı olmuş müasir padşahları***ndan soz açır və əsərlərindən çox kiçik nümunələr verməklə on iki şəxs haqqında məlumat verir.

Təzkirənin ***ikinci məcməsi şahzadələr haqqında***dır. Əsərlərindəki qısa nümunələr verilən bu şair-şahzadələrin sayı səkkizsir.

***Üçüncü məcmə səltənət sütunu olan türklər haqqında***dır. On bir nəfəri əhatə edən bu fəsildə məhşur türk şairlərimizdən Yusif bəy Çavuşlu, Məhəmməd bəy Əmani və başqalarından söz açılır. Maraq doğuracaq hallardan biri də budur ki, Yusif bəy Çavuşlunun təzkirədə nümunə kimi verilmiş uç qəzəlindən biri şairin London muzeyində mühafizə edilən OR-15398 şifrəli "Divan"ında yoxdur. Sadiq bəy Əfşarın bir ədəbiyyatşunas kimi bu şair haqqında gəldiyi nəticə çox dəqiq və lakonikdir:

"Şeir təbi Mövlana Füzuliyə yaxındır. Divanını onun rədif və qafiyələri ilə bağlayıb". Məhəmməd bəy Əmani haqqında isə belə deyir: "...Özü türk, əməli saleh, işi ibadət, pisliklərdən uzaq bir insandır...

Yəzd hakimi olduğu vaxtlarda bəzən lütf edib yazdıqları şeirləri dinləmək üçün məni də məclislərinə çağırtdırardı. Şerlərindən feyz alırdım".

***Dördüncü məcmə***də ***səltənət sütunu olan taziklər (-iranlılar) haqqında*** söz açılır və bu fəsil otuz üç şairi əhatə edir. Bu fəsildə

maraqlı şəxsiyyətlərdən biri kimi Mirzə Hatəm bəyi göstərmək olar. Təzkirəçi onun haqqında yazır: "Ordubadlıdır. Azərbaycana tabe olan kiçik bir qəsəbədir... Çox istedadlı və qüdrətlidir. İnşa və imla-da və yazıçılıqda lazım olan türkcə və farsca istilahları yaxşı bilir. İnşa babında yazılmış az risalə və kitab tapılar ki, Mirzə onları mü-taliə etməmiş olsun... Son vaxtlarda şeir yazmağa başladılar. Çalış-salar yaxşı olar.

***Beşinci məcmə səltənət sütunu olan türklərin və taziklərin (-iranlıların) böyük övladları haqqında****dır*. On beş nəfəri əhatə edən bu fəsildə şairin şəxsən görüşdüyü insanlar və yaşadığı tarixi məqamlar haqqında maraqlı faktlar var.

Təzkirənin çox maraqlı fəsillərindən biri də ***altıncı məcmə****dir*. Bu fəsil ***peyğəmbər nəslindən olan şairlər haqqında****dır*. Təzkirəçi-nin öz ustadlarından biri saydığı Mir Sün'i ilə başlayan bu fəsildə otuz doqquz şəxs haqqında məlumat verilir. Bu insanların hər biri özlüyündə öz dövrünün tanınmış və görkəmli şəxsi olmaqla yanaşı həm də şeir demişlər. Lakin, şairliklə yanaşı onların həm də dünyəvi peşələri, dolanmaq üçün sənətləri olmuşdur. Məsələn, Mir Əbu Turab Ələvi haqqında təzkirəçi yazır: ***"Həmədanda təbabətlə məş-ğul idi. Müalicəsi bir fayda gətirməsə də qədəmlərinin bərəkətin-dən xəstələri bir o qədər də tələfat vermirdilər"***. Mir Cəzmi haq-qında: ***"Təbrizdəndir. Öz vilayətində əttarlıqla məşqul olurdu".*** Mir Cəfəri isə ***"Təbrizdə çəkmətikən idi. Qürur və himmətinin çoxluğundan şairliyi ar bilib öz sənəti ilə dolanır"***.

Təzkirəçi ***yeddinci məcmə****nin* əvvəlində yazır: ***"... Türk, fars və ərəb dillərində söz demək güdrətinə malik olub, ərəb və əcəmdə şöhrət tapmış türk şairləri haqqında ..."***. Bu fəsil böyük Azərbay-can şairi, türk dünyasının fəxri Məhəmməd Füzuli ilə açılır. İyirmi səkkiz şairi təqdim edir. Sadiq bəy Əfşarın bu fəsildə böyük şair haqqında dediyi sözlər bu gün də Məhəmməd Füzuli haqqında əli-mizdə olan ən etibarlı və dəyərli fikirlərdən biri sayılır. Bu fikir Mə-həmməd Füzuli haqqında söz deyən hər bir tədqiqatçının təsdiq et-diyi məqamdır desək yanılmarıq.

Təzkirənin ən böyük fəsli ***səkkizinci məcmə****dir*. ***Əcəmin müasir fəsahət və bəlağət sahibləri haqqında*** olan bu fəsil 222 şairi əhatə etməklə müəllifin müasiri olduğu onlarla yeni adlar, o cümlədən,



azərbaycanlı şairlər haqqında məlumat verir. Ümumiyyətlə Sadiq bəy Əfşar üçün təqdim etdiyi hər bir şairin şəxsi keyfiyyətləri, mə-nəvi dəyərləri birinci cərgədə durur, ondan sonra isə onun şairliyi, sənəti və sənətkarlığı gəlir. Bütün təzkirə boyu, söhbət istər böyük hökmdardan, istərsə də adi insandan getsin, müəllif bu prinsipə sa-diq qalır.

Dövrün tarixi hadisələri, ədəbi mühit və ədəbi əlaqələr, müəl-lifin dünyagörüşü və bunlara münasibəti əsərdə öz maraqlı və dol-ğun əksini tapmışdır.

Sadiq bəy Əfşarın ***"Məcməül-Xəvas"*** təzkirəsinin hazırki nəşri əsərin Təbriz Dövlət Kitabxanasında saxlanılan ***külliyyat****dakı* (№ 3616) mətninə əsaslanır və yeri gəldikcə, Doktor Əbdür-Rəsul Xəyyampurun Təbriz çapı ilə tutuşdurularaq müqayisəli mətn şək-lində təqdim olunur. Qeyd etmək lazımdır ki, Doktor Xəyyampurun istifadə etdiyi mənbələr, özünün müqəddimədə yazdığı kimi, Türki-yənin İstanbul Universiteti kitabxanasında saxlanılan 4085 №-li (tarixi h.1016-cı il) və 4097 №-li (tarixi h.1037-ci il) nüsxələrlə yanaşı Nurosmaniyyə kitabxanasında 3720 №-si altında qeyd edimiş (tarixi h. 1021-ci il) əlyazma nüsxələri olmuşdur. Sadiq bəy Əfşarın ***külliyyat****ının* başqa nüsxələri (Tehran, Məlik, № 6325; Tehran, Universitet, № 7395 və s.) haqqında İran aliminin məlumat verməməsini həmin dövr üçün bu əlyazmaların yəqin ki, elmi dövriyyədə olmaması ilə izah etmək olar. Bu nüsxələr Sadiq bəy Əfşarın Təbriz külliyyatında olmayan başqa əsərlərindən (***Sə'd və Səid*** məsnəvisi, ***Həcvi-Sales*** tənqidi əsəri və s.) xəbər versələr də biblioqrafik mənbələr onlarda təzkirənin olmaması fikrini yaradır. Məlum olduğu kimi, ***"Məcməül-Xəvas"****ın* İranda olan üç əlyazma nüsxəsindən biri Tehranda Sipəhsalar kitabxanasında olsa da, Məhəmmədəli Tərbiyətin öz məşhur əsərini yazarkən istifadə etdiyi üçüncü nüsxənin məkanı bizim üçün hələ ki, qaranlıq olaraq qalır.

***"Məcməül-Xəvas"*** təzkirəsi üzərində iş, qeyd olunmalıdır ki, bi-zim tərəfdən əvvəlcə Sadiq bəy ***külliyyat****ının* Təbriz əlyazmasının fotosurəti üzərində başlasa da, çox tezliklə məlum oldu ki, fotosurət naqisdir, bir çox səhifələri isə oxunmağa belə yararlı deyil. Bu sə-bəbdən də Təbriz nüsxəsinin əsli ilə tanış olmaq, təzkirənin dəqiq surətini əldə etmək üçün Təbrizə ezam olunduq və külliyatla tanış

olaraq təzkirənin fotosurətini əldə edə bildik.*

Təbriz əlyazması ilə tanışlıq və əldə olunan kamil mətn bir sıra qaranlıq məqamlara aydınlıq gətirdi. Belə ki, Doktor Xəyyampur nəşrindən fərqli olaraq (332 şair), ***külliyyat*** nüsxəsində olan şairlərin sayı 369-dur (müəllifin özündən başqa). Bundan əlavə ***külliyyat*** katib tərəfindən** köçürüldükdən sonra cildləmə zamanı təzkirənin mətni iki yerə ayrılmış və ***əlyazma***nın sonradan müasir üsulla səhifələnərək adi xətlə yazılmış mündəricatına əsasən 410-440 (***Təzkirətüş-Süəra – "Məcməül-Xəvas"***) və 627-888-ci səhifələrini (***Bəqiyyeyi-Təzkireyi-Şüəra***) əhatə edir.

***Külliyyat***a daxil olan əsərlər sonradan yazılaraq əlavə edilmiş mündəricatda aşağıdakı şəkildə təqdim edilir:

1. ***Qəsidələr ("Zübdətül-Kəlam")*** s.9
2. ***Qəzəllər*** s.133
3. ***Müxtəlif şeirlər*** s.394
4. ***Şairlər təzkirəsi - ("Məcməül-Xəvas")*** s.410
5. ***Rübailər*** s.440
6. ***Məqalə və mənzum hekayətlər*** s.446
7. ***Şairlər adına deyilmiş müəmmalar*** s.454
8. ***"Fəthnamə" məsnəvisi*** s.474
9. ***Şairlər təzkirəsinin ardı*** s.627
10. ***Türk dilində yazılmış qəsidə və qəzəllər*** s.888
11. ***Feyzi şeirləri haqqında risalə*** s.920
12. ***"Qanunüs-Süvər" – rəssamlıq haqqında risalə*** s.934
13. ***"Həzziyyat" risaləsi*** s.948
14. ***Mərsiyə və tərkibbənd*** s.964
15. ***Tərkibbənd – əlifba sırası ilə*** s.986
16. ***Tərcibənd*** s.994
17. ***Heydərinin həcvi*** s.1000
18. ***Münşəat – türk və fars dillərində*** s.1008

* Bu işdə bizə yardımçı olmuş İİR-nın Bakıdakı səfirliyinin mədəniyyət mərkəzinə və Təbriz Dövlət Kitabxanasının rəhbərliyinə minnətdarlığımızı bildiririk.

** Çox istərdik ki, əsərləri ilə ustadımız mərtəbəsində duran Əziz Dövlətabadinin bu nüsxə haqqında olan ***avtoqraf*** fikri ilə razılaşaq. Təəssüf ki, arzu olunanla həqiqət həmişə üst-üstə düşmür.



19. ***Fələkdən şikayət və Məhəmməd bəy Məzaqinin həcvi*** s.1044
20. ***Müxtəlif həcvlər*** s.1062

***Külliyyat***dakı əlyazma mətni ilə Təbriz çapındakı mətni tutuşdurarkən bir sıra variant fərqləri üzə çıxmış və onlar bu nəşrdə bütünlüklə təqdim edilərək hər bir konkret halda xüsusi olaraq qeyd edilmişdir.

***Külliyyat***ı görmədən fikir yürütmüş və ya yürüdülmüş fikri təkrarlamış tədqiqatçıları pərişan edə biləcək bir məqam da budur ki, təzkirənin ***altıncı məcmə***sinin sonunda – ***peyğəmbər nəslindən olan şairlər fəsli***ndə bu fəslə aidiyyatı olmayan 138 Orta əsr türk-Osmanlı şairinin adı sadalanır, haradan olması, məşğuliyyəti göstərilməklə yaradıcılıqlarından çox kiçik nümunələr təqdim edilir. Şairlərin təqdim edilmə üsulu ***"Məcməül-Xəvas"***dan açıq-aşkar fərqlənən bu səhifələri ən yaxşı halda Sadiq bəy Əfşarın qaralama yol qeydləri, ən pis halda isə katib əlavəsindən başqa bir şey hesab etmirik. Orta əsr türkdilli təzkirələrin gələcəkdə müqayisəli tədqiqata cəlb edilməsi, hər halda, bu mövzuya aydınlıq gətirə bilər. Hələlik isə bu hissənin kiçik bir təzkirə kimi tədqiqatçılar üçün maraqlı ola biləcəyini nəzərə alaraq əlyazmada əlifba sırası ilə verilmiş şair adlarını bu kitaba əlavə kimi sonda təqdim edirik [bax: s.359-362].

Qeyd olunmalı məqamlardan biri də budur ki, Sadiq bəy Əfşar və onun təzkirəsi ətrafında araşdırma aparmış hər bir tədqiqatçıya məlum olduğu kimi, Doktor Əbdür-Rəsul Xəyyampur tərtib etdiyi kitaba yazdığı ön sözdə təzkirəçinin özü, əsərləri, etdiyi səfərlər, görüşdüyü insanlar haqqında təzkirədə verilmiş məlumatları toplayaraq 34 maddə altında təqdim etmiş və oxucuların diqqətini həmən faktlara yönəltmişdir. Bu istiqamətdə olan araşdırmaların tədqiqatçılar üçün qiymətli, oxucular üçün isə maraqlı ola biləcəyini nəzərə alaraq biz də Təbriz əlyazma nüsxəsi əsasında üzə çıxmış və bu nüsxənin dəyərlərindən sayıla bilən bəzi əlavə faktları qeyd etməyi məqsədəuyğun saydıq. Belə ki, Sadiq bəy Əfşar:

- Nişapurun mötəbər seyidlərindən olan Mir Məsum xanla h.1013-cü ildə İraqda görüşüb və ondan yadigar olaraq ***Divan***ını qəbul edib (№ 40).

- Herat bəylərbəyi Əliqulu xan Şamlunun vəziri Mirzə Əhmədin oğlu Mirzə Mələkidən sonuncu Mosulda olarkən şeir qəbul edib

təzkirəyə daxil etmişdir (№ 46).

- Mirzə Ərəb Müqəllidlə şəxsən Məşhəddə görüşmüş və onun xoş rəftarının şahidi olmuşdur (№ 51).

- Girdbadiqanlı şair-xəttat Mövlana Hişməti ilə yaxından tanış olmuş, tez-tez onu evində qəbul etmişdir (№ 211).

- İsfahanlı kimi tanınan rəssam-şair Zəmani Nəqqaş ilə şəxsən tanış olmuşdur (№ 228).

- Həmədanlı Mövlana Musa Riza ilə birlikdə naqqaşlıq və rəssamlıq dərsi almışdır (№ 283).

- Təbrizli Hafiz Əndəlib ilə həmsöhbət olmuşdur (№ 287).

- Dirəxş adlı qəsəbədə xalçaçılara müdirlik etmişdir (№ 330).

- Məşhəddə Bəlxdən olan və Azəricə yazan Cünuni adlı şairə qarmaqarışıqlıq zamanı evində sığınacaq vermişdir (№ 342).

Vaxtilə İran alimi Doktor Əbdür-Rəsul Xəyyampur Sadiq bəy Əfşar haqqında söz deyərkən onun əsərlərində verilən məlumatlardan əlavə cəmi iki mənbəyə: bir mənbə kimi bu təzkirədən hərtərəfli şəkildə istifadə etmiş Məhəmmədəli Tərbiyyətin "Danişməndani-Azərbaycan" və böyük Azərbaycan tarixçisi İskəndər bəy Münşinin "Tarixi-Aləmarayi-Abbasi" əsərlərinə müraciət etsə də, sonradan başqa mənbələr də elmi dövriyyəyə buraxılmış və rəngarəng məlumatlar üzə çıxmışdır. Bütün bunlar haqqında öz biliklərini artırmaq istəyən oxucunu isə biz Sadiq bəy Əfşarın həyat və yaradıcılığı haqqında maraqlı tədqiqat işi çap etdirmiş filol.e.n. Məntiqə Muradovanın ***Sadiq bəy Sadiqinin həyat və yaradıcılığı*** adlı kitabına (Bakı – 1999) və o kitabda verilmiş mənbələrə istiqamətləndiririk.*

Sadiq bəy Əfşarın mənəvi aləmini, sənətə və sənətkara olan yanaşma üslubunu, bir insan kimi insanlara olan münasibətini açıqlayan faktlarla zəngin olan ***"Məcməül-Xəvas"*** təzkirəsinin hazırkı nəşri, heç şübhəsiz, Azərbaycanın bu böyük sənətkarının ədəbi-elmi irsinin öyrənilməsində yeni üfüqlər açmaqla yanaşı, XVI-XVII əsrlər ədəbiyyatımızın, ədəbiyyatşünaslığımızın, ədəbi-tənqidi və mədəni mühitimizin araşdırılmasında dəyərli bir mənbə, real bir qaynaq olacaq.

---

* Bu gün ***"Məcməül-Xəvas"*** təzkirəsinin nəşr olunmasının səbəbkarlarından biri kimi beş il əvvəl bizi bu işə həvəsləndirmiş ağbirçək alimə öz minnətdarlığımızı bildiririk.





## ❦ MÜQƏDDİMƏ ❦

Ya rəb, sədəfi-təb'imi gövhərza qıl,
Xurşid kəlamımnı cəhanara qıl.

Könlüm neydir, şəkkərin ilə dərya qıl,
Yəni dilmi həmdin ilə guya qıl.

Ey qətreyi-feyzi-rəhmətin bəhri-nəval,
Vey qülzümi-lütfünə cəhan qətrə misal.

Etdin sədəfi-təb'imi çün dürci-xiyal.
Qıl gövhəri-nə'tilən ani malamal.

Ey təng qaşidə ərseyi-çərxi-vəsi',
Vey pəst rəhində payeyi-əqli-rəfi'.

Ya rəb, nə qıla bizgə bu əf'ali-şəni,
Gər qılmıyasın Əliyyü övladi-Şəfi'.

...O böyük Allahı həmd və dua etdikdən sonra Sadiqi Kitabdar fars və türk müəlliflərinin yazdıqları bu təzkirələri böyük hörmətlə yad edir: Əbdürrəhman Caminin «Baharistan» əsərinin bir rövzəsi, Əlişir Nəvainin «Məcalisün-Nəfais», Dövlətşah təzkirəsi, «Töhfeyi-Sami».

Və yazır ki, bu ardıcıllığın pozulmaması üçün mən də müasir şairlər haqqında Əmir Əlişir Nəvainin «Məcalisün-Nəfais» təzkirəsi kimi səkkiz fəsildən ibatər olan bir təzkirə yazdım və adını «Məcməül-Xəvas» qoydum. Və əsəri Şah Abbas dövründə bitirdim...*

* Üç nöqtə qoyulmuş yerlərdə təmtəraqlı nəsri yüngülləşdirən ixtisara yol verilmişdir.

*Məsnəvi:*

Məşəqqət mülkünün bixanümanı,
Məlamət dəftərinin nüktədanı,

Məhəbbət guşəsinin xaki-ruyi,
Məvəddət məclisinin payi-kuyi,

Həqarət dəştinin əz'əf giyahı,
İradət dərgəhinin xaki-rahi,

Vəfa sərrişrtəsinin payibəndi,
Dəvasız dərdi-eşqin dərdməndi,

Məlalət üqbasının guşəgiri,
Gədalıq astanının fəqiri,

Təcərrüd kişvərinin kamiranı,
Təfərrüd məclisinin qissəxanı,

Bəla həngaməsinin pişdəsti,
Fəna xümxanəsinin meypərəsti.



Ol kim moqol istilahın eyləyib məşhur,
Aldı ərəbü əcəm elidən mənşur.

Bolsa nə əcəb cahan tilinə məzkur,
Kim heç kişiyə bu yanlıq irmas məqdur.

Bir neçə sözünə güzariş berib,
Bir neçə səfhəyə nigariş berib.





*Rübai:*

Ya rəb, bu söz əhlinin dilara zikrin,
Bu löcceyi-danişin göhərza zikrin,

Mənzuri-xəvasilə ə'la zikrin,
Məqbuli-əvam ilə ədna zikrin,

Yüz şükr ki, bu təzkireyi-xeyrkəlam,
Bu Şahi-Cəhan zamanıda boldu təmam.

Kim tapdılar iltifatidən xas ilə am,
Həm işrəti-bərdəvamü həm eyşi-müdam.

*Qitə:*

Ol Sekəndər şə'nü Dararay kim ədli belə,
Tutdular zülmü təəddi dəhr bağidən kənar.

Ol ki, tiği-abdarı birlə düşmən xeylini,
Seyli-xunriz təvəccühdən qılıbdır tarümar.

Ol ki, dəftərxaneyi-qədrində səbt etmiş adın,
Şah Abbasi-Əbülfəthi-müzəffər kirdikar.

Ta qəza qılqay təmənnayi-qədr birlə müdir,
Ta qədr etkay təğazayi-qəza birlə mədar.

Bu şəhənşahi-cəvanbəxtin nihai-dövləti,
Gülşəni-iqbalü nüsrət içrə bolsun paydar.

***Şah Abbasın dediyi şeirlərdən:***

*Nəzm:*

Ze qəmət çenin ke xarəm ze kəsan kənar darəm,
Məno bikəsiyo xari be kəsi çe kar darəm.

Məqzar bare-digər be deləm ze sər gerani,
Ke be sine kuhe-həsrət məne-bordbar darəm.

Məqşa zəban be porseş boqzar ta bemirəm,
Ke ze coure-bihəde-to gele bişomar darəm.

⸻⸻

***Rübai:***

Ya rəb, ki yeri çərx binası bolsun,
Təsbihi-mələk zikri-duası bolsun.
Əflak inankeşi-rizası bolsun,
Ta dövr bəqasıdır, bəqası bolsun.
***Amin ya rəbbül-aləmin!***

Ya rəb ke benaye-çərx cayəş bada,*
Təsbihe-fereşteqan doayəş bada,
Əflak enankeşe-rezayəş bada,
Ta doure-fələk həst bəqayəş bada.
***Amin ya rəbbəl-aləmin!***

* Rübainin fars variantı Təbriz nüsxəsində (bundan sonra *əlyazma*da) yoxdur. Doktor Əbdür-Rəsul Xəyyampur tərəfindən h.1327-ci ildə Təbrizdə çap olunmuş mətnindən (bundan sonra ***çap nüsxəsi***ndən) götürüldü.





***Əvvəlinci məcmə***

***...Müasir padşahlar haqqında...***

... Bu müxtəsər risalənin elə bir imkanı yoxdur ki, padşahların tərcümeyi-hallarının mindən bir hissəsini təfsilatı ilə yaza bilək. Əlacsız qalaraq onların şərif adlarını çəkməklə və lətif şeirlərindən nümunələr verməklə kifayətlənirik...

## 1. ❁ ŞAH TƏHMASİB HÜSEYNİ* [ADİL] ❁

**qəbri nurla dolsun**

❁ شاه طهماسب حسینی [عادل] ❁

Adlı-sanlı padşah idi. Öz əba və əcdadı kimi şücaət və qüdrət, himmət və hidayət sahibi idi. Əlli üç il padşahlıq etdi. Şahlığının birinci yarısında hansı dövlətə üz tutdusa zəfər çaldı. Ona müqavimət göstərə bilmədilər. Müqavimət göstərənlər əzildilər. Şahlığının ikinci yarısında Hind və Rumdan olan rəqibləri onun dərgahına üz tutdular, ona pənah gətirdilər. Türkistan və Firəngistan qiyamçı və başçıları onun üçün töhfə və hədiyyələr göndərirdilər. Fitri istedadı elə bir səviyyədə idi ki, ruh oxşayan sözləri başdan-başa lətif və zərif idi. İstəsəydi bütün ömrü boyu gözəl şeirlər deyərdi. Əmir bəy Mehrin** mədhinə bədahətən dediyi aşağıdakı şeir kimi:

*Məsnəvi:*

Ey booland əxtəre-sepehre-şərəf,
Vey gerami dore-xocəste sədəf.

Rande dər qolzome-vəzarət folk,
Karfərmaye-səd-Nezam əl-Molk.

Nist dər zire-çərx çon to vəzir,
Şərəfe-ruzegare-bənde Əmir.

Bədahətən deyilmiş belə beytləri çoxdur. Rəssamlıq fənnində elə mahir idi ki, kitabxanada çalışan çox görkəmli ustadların ya-

---

* H.920-984, şahlıq illəri: h. 930-984

** Xacə Əmir bəy Mehrdar. H.983-də Ələmut qalasında həbsdə vəfat edib.

ratdıqları əsərləri o padşah bəyənməsəydi həmən işlər tamamlanmazdı. Ustadımız Ustad Müzəffərəli Nəqqaş (№268) – saray rəssamı, özü də Ustad Behzadın bacısı nəvəsi – o mərhum ustaddan sonra öz istedad və bacarığını bu padşahın təlim və tərbiyəsinə sərf etdi. Mərhumun alimlərə, müdriklərə və fəzilət sahiblərinə elə böyük hüsn-rəğbəti var idi ki, qırx ildən böyük bir müddətdə istər böyük, istərsə də kiçik, istər sözdə, istərsə də əməldə heç ir günaha yol vermədi. Səxavət və kəraməti elə bir həddə idi ki, ümumi məbləği hər il səkkiz min tüməndən çox olan bir vergidən ticarət əhlini azad etdi. Yollardan yol kəsənliklə məşğul olan vergi yığanları götürməklə yolçuların ürəyindən kin və küdurəti təmizlədi. Şeir deməkdə ardıcıllıq göstərməsə də, təbinin dəryasından çıxan hər bir gövhər dünya əhlinin qulağında sırğa olub qalırdı. Bu rübai də mərhum şahın təbinin məhsuludur:

*Rübai:*

Yekçənd be yaqute-tər alude şodim,
Yekçənd peye-zomorrod sude şodim.
Aludegi bud be hər hal ke bud,
Şostim be abe-tobe və asude şodim.

## 2. SULTAN MƏHƏMMƏD XUDABƏNDƏ[*] [FƏHMİ]

سلطان محمد خدابنده [فهمی]

Mərhum şahın[**] böyük oğludur. Kəramət və səxavət sahibi olan bir padşah idi. Rəssamlıq, şeir qaydaları və musiqi istilahlarından çox baxəbər bir şəxs idi. Bu beytlər o padşahındır.

*Qəzəl:*

Ço nəqşe-əbruye-u dər şərabe-nab nəmayəd,
Hilal id bovəd kəz fələk dər ab nəmayəd.

Fəğan, ke nist çenan məhrəmi ke, nameye-şouqəm,
Ze ruye-lotf nehani bedan cənab nəmayəd.

[*] Şahlıq illəri: h.985-996

[**] I Şah Təhmasib nəzərdə tutulur (bax: № 1).



Ze dərdməndiye-*Fəhmi* be Vacebi şəvəd agəh,
Əz in qəzəl do-se beyti gər entexab nəmayəd.

Bu rübaini pis deməyib:

*Rübai:*

Deldare-məra bər qəme-əğyar emşəb,
Dadəst be bəzme-xiştən bar emşəb.
Ey sobh, çerağe-eyşe-mara nəkeşi,
Zenhar, dəme-xiş negəh dar emşəb.

## 3. ŞAH İSMAYIL SANİ[*] [ADİLİ] شاه اسمعیل ثانی [عادلی]

Mərhum şahın (№ 1) böyük övladı idi. Rəssam təbiətli, incə zövqlü, böyük şərəf sahibi və heybətli bir padşah idi. Zahirən çox bədgörkəm olmasına baxmayaraq daxilən olduqca mülayim və xoşəxlaq idi. Şahzadəlik dövründə bir çox cəsarətli işlərə əl qoydu və o səbəbdən mərhum şah şərəf və nüfuzunu qorumaq xatirinə o həzrəti iyirmi bir il Qəh-qəhə qalasında əsir etdi. Əmirlərin ona məktubla müraciət etmələrinə və yanına elçilər göndərmələrinə baxmayaraq, şahzadə padşahın əmrindən çıxmağı ağlına belə gətirmədi. Padşahın humay quşu cənnət bağçasındakı ağaca qonduqdan sonra şahzadənin səadət quşu şahlıq taxtına əyləşdi. Şahlığının ilk günlərindən zəhmi ürəkləri elə almışdı ki, iki ildən artıq bir müddətdə sərhədlərə heç bir hakim göndərilmədi və buna baxmayaraq bir kimsənin sərhəddi pozmağa və yol kəsməyə cürəti belə çatmadı. Fələyin yazısı onun əməlləriylə düz gəlmədi və izahı aqillərin ağlına belə gəlməyən çox qeyri-adi bir hadisə nəticəsində dünyasını dəyişdi. Şeirin hər bir növündə məharəti var idi. «*Adili*» təxəllüsü ilə yazardı. Bu rübai onundur:

*Rübai:*

Douran mara ze vəsl şadan nəkonəd,
Coz tərbiyəte-rəqib nadan nəkonəd.

[*] Şahlıq illəri: h. 984-985; 45 yaşında ölüb, Ərdəbildə dəfn olunub.

Hərgez nərəsanəd dele-mara be morad,
Kari be morade-namoradan nəkonəd.

Aşağıdakı rübaini həbsdə öz vəziyyəti haqda yazıb:

*Rübai:*

An ruz ke, karət həmegi qəhqəhe bud,
Əz raye-to rahe-məmləkət sədməhe bud.
Emruz dər in Qəhqəhe ba gerye besaz,
Kan qəhqəhera nətice in Qəhqəhe bud.

Bu beyti onun öz dilindən eşitmişəm:

*Beyt:*

Məno eşq əgərçe başəd həme haseləm ze xuban,
Ze omid naomidi, ze morad namoradi.

Ney çeşme-tora suye-əsiran nəzəri həst,
Ney bər delət əz ahe-qəriban əsəri həst.

Qofti ke, məra həst bəsi çon to gereftar,
Benma be gereftariye-mən gər degəri həst.

Şadəm be xədənge-to ke navək fekənanra,
Penhan suye-amac ke, xod nəzəri həst.*

## 4. ❁ XAN ƏHMƏD PADŞAH** خان احمد پادشاه ❁

Deyilənə görə ətraf padşahlar içərisində ondan nüfuzlusu yox idi. Ömrünün ilk çağlarında küşti tutanlara, qılınc oynadanlara, oyunbazlara, heyvan gəzdirənlərə..., bir sözlə, bütün mərə-

* Sonuncu üç beyt *çap nüsxəsində* yoxdur.

** Xan Əhməd Sultan Həsən oğlu h.760-dan 999-a qədər Gilanda hakimyyət sürən Karkiya sulaləsindəndir. Xan Əhməd padşah h.943-də hakimyyətə gəlib və h.975-də Əmir Məsum bəy Səfəvi tərəfindən əsir alınıb, 10 il həbsdən sonra h. 985-ci ildə (II Şah İsmayıl dövründə) zindandan azad olur və öz əvvəlki hakimiyyətinə qayıdır. Lakin h.999-cu ildə Şah Abbas onu məğlub edərək Karkiya sülaləsinin axırına çıxır.



kə tayfasına himayədarlıq edirdi. Əksəriyyətin fikrincə onun qapısına ümidlə gələn layiqli bəndəni naümid qoymayıb. Musiqi, hikmət və astronomiya elmlərindən məlumatı var idi və müxtəlif musiqi alətlərində pis çalmırdı. Şeiri də belə deyir:

*Qəzəl:*

Şame-fəraq kare-məne-zar moşkel əst.
Sobhe-vosal əgər nədəməd kar moşkel əst.

Can dadənəm be paye-to asan bovəd, vəli
Məhrumiyəm ze douləte-didar moşkel əst.

Şayəd əcəl mədəd konəd **Əhməd** ke, varəhəm
Əz mohnəte-fərağ ke, besyar moşkel əst.*

Bəxt varun, dust doşmən yar yare-digər əst.
Rəft an ruzi ke didi ruzeqare-digər əst.

Nəşnəvəd əz kəsi peyame-məra,
Ke nəbayəd şenid name-məra.

Xəmuşiye-şəbe-hecrəm nə əz səburi bud.
Dəmi ke nale nəkərdəm ze bi şouri bud.

Deyirlər bu beyt də Xanındır:

*Beyt:*

Məne-məcnunsefət əz muye-sər pirahəni darəm,
Ze mu bariktər dər zire-pirahən təni darəm.

## 5. ❁ HUMAYUN PADŞAH** همایون پادشاه ❁

Böyük səxavət və kəramət sahibi olan incə zövqlü bir padşah idi. Kitabxana işinin zinət və rövnəqinə çox həvəsi var idi. Əbül-

* Beyt *çap nüsxəsində* yoxdur.

** Nəsrəddin Humayun. Baburun oğludur, hakimiyyət illəri: h.937-963. Baburun hakimiyyət illəri: h.932-937

qazi Sultan Hüseyn Mirzədən* sonra cığatay padşahları arasında Humayun padşahdan xoştəb padşah çox az olubdur. Qardaşı Kamran Mirzə** tərəfindən məğlub olunub mərhum padşaha (I Şah Təhmasib, № 1) pənah apardı. Qızılbaş ordusunun köməyi ilə öz düşmənini məğlub edib Hindistan qapılarını öz üzünə açdı. Mülayim şeir təbinə malik idi. Türkcə yazdığı bu iki beyti çox məşhurdur:

*Nəzm:*

Qəriblik qəmidən möhnətü məlalım bar,
Bu qəmdən ölümqə yetdim qərib halım bar.
Vüsali-dövlətidən ayrılıb məni-məhzun,
Tirinmənü bu tirinlikdən infialım bar.

## 6. SULTAN SÜLEYMAN XONDGAR [MÜHİBBİ]***

## سلطان سليمان خواندگار [محبى]

Adil, mehriban və rəiyyətpərvər bir padşah idi. Şeiri və şairləri çox sevirdi. Özü də çox mülayim şeir təbinə malik idi və ***Mühibbi*** təxəllüsü ilə yazırdı. Deyilənə görə bu təxəllüsü onunla mərhum padşah (I Şah Təhmasib, № 1) arasında olan düşmənçilik dostluğa və ədavət məhəbbətə çevrilən vaxt qəbul edib. Hər halda bu təxəllüsdən məhəbbət zahir olur. Bu beytlər o padşahındır:

*Şeir:*

Başım diyari-qəmdə bəla kühsarıdır,
İki gözüm həmişə anın bidarıdır.****

Bəzmi-mey eyləmişəm dün gecə soltanlar ilə,
Necə soltanlar ilə, bisərü samanlar ilə.

---

* I Şah İsmayılın oğlu Bəhram Mirzənin oğludur. II Şah İsmayıl dövründə qətlə yetirilib.
** H.964-də vəfat edib.
*** Sultan Süleyman Qanuni – Osmanlı padşahı. Hakimiyyət illəri: h. 926-974
**** Bu və sonrakı üç beyt ***çap nüsxəsində*** yoxdur.



Məstü aşiqü şeyda ləvəndü yəqə çak.
Gəzərəm bisərüpa cəm'i-pərişanlar ilə.

Vəh nə xoş boldi ki yoxdur bəni-Adəmdə xəfa
Ol ki, Məcnuni ənis eylədi heyvanlar ilə.

Həmdəmin hər dəmdə bir gül yüzlü canan oldu, tut,
Məhrəmin dün gün məhü xurşidi-rəxşan oldu, tut*

Tacü təxti-səltənət bərbad olur çün aqibət,
Kəndüni aləm sərirində Süleyman oldu, tut.

Qaldırırsan bəzmi-aləmdən əyağı çün könül
İçdigin cami-şərabı abi-heyvan oldu, tut.

Dəhr bağının, ***Mühibbi***, yox ğülündə buyi-lütf,
Dağlar cismində yer-yer vərdi-xəndan oldu, tut.

Hələb şəhərində Baqi Çələbidən (№ 128) eşitdiyim farsca bu mətləni də ona aid edirdi:**

***Mətlə:****** 

İn həme sərkeşiyo bisəro samaniye-ma,
Bəhre-cəmiyyəte-delhast pərişaniye-ma.

## 7. ÜBEYD XAN ÖZBƏK**** عبيد خان اوزبک

Çox incə zövqə malik, şair təbiətli və xoştəb bir padşah idi. Özbək elində o padşahdan cəsuru olmayıb. Şahi-cənnətməkan

---

* Bu və sonrakı üç beyt ***əlyazmada*** yoxdur.
** Baqi Çələbi (h.933-1008) Hələb qazısı olan ustadı ilə h.963-cü ildə İstanbuldan Hələbə gedib və h.967-də onunla İstanbula geri dönüb.
*** ***Çap nüsxəsində*** olan beyt ***əlyazmadan*** fərqlənir:

Dide əz atəşe-del ğorfeye-ab əst məra,
Kare-in çeşme ze sərçeşme xərabəst məra.

**** Übeydulla xan Özbək – Şeybani sülaləsindən olan Mahmudun oğludur. Mavərənnəhrdə hökumət sürüblər. Übeydullahın hakimiyyət illəri: h.940-946

ilə (I Şah Təhmasib ilə, № 1) üz-üzə durdu. Məğlub olsa da qəhrəmanlıq göstərdi, mərdü-mərdanə vuruşdu. Şeirin hər növündə təbi yaxşıdır. Düşmənlərinin kinayəsi izharında və özünün tənəsi isbatında olan aşağıdakı rübaini çox gözəl deyib:

***Rübai:***

Ey qoum, ke əz şoma ətayi nərəsəd,
Nəf'i be fəqiro binəvayi nərəsəd.
Səhl əst agər səre-şoma miyarənd,
Bayəd qədəme-şoma be cayi-nərəsəd.

Bu məşhur beytlər də onundur:

***Şeir:***

Mobarək bad ide-an dərdmənde-bikəs ke ura,
Ke ney kəsra mobarək bad quyəd, ney kəsi ura.

Ey moəzzen, bər səre-tabute-mən fəryad kon,
Yarra aqah sazo ruhe-mara şad kon.

Buye-ərbabe-vəfa əz qole-ma miyayəd,
Kəbe zanru be təvafe-dele-ma miyayəd.

Nist sərmənzele-ma qabele-hər naəhli,
Hər ke əhl əst be sərmənzele-ma miyayəd.

## 8. ❁ ABDULLA XAN ÖZBƏK [ƏVƏZ QAZI]* ❁

❁ عبدالله خان اوزبک [عوض غازی] ❁

Özbək padşahlarının ən şücaətlisi, böyük xanlarının ən səxavətlisidir. Həm türkcə, həm də farsca şeir yazır. Təxəllüsü ***Əvəz Qazi***dir. Aşağıdakı beytlər o padşahındır:

* Şeybani sülaləsindən olan İskəndərin oğludur. H.964-cü ildə Buxaranı aldı və özünə paytaxt etdi və 986-cı ildə Səmərqəndi də özünə birləşdirdi. 991-ci ildə atasının ölümündən sonra II Abdulla adı ilə onun yerinə taxta əyləşdi və 1006-cı ilə qədər hökmranlaq etdi.



***Şeir:***

Ta tilbəliyim şöhrəti-aləmni tutubdur,
Andan bəri Məcnun sözünü el unudubdur.

Navəkləri məndən keçib əğyarqə dəydi
Canım bilir ol dəmki nələr məndən ötübdür.

Biçarə ***Əvəz Qazi*** nəytib vəsliğə yetsin,
Hicran odu çün nəxli-ümidin qurudubdur.

Fərhad ilə Məcnun nə bilir eşq fünunin,
Bu vadidə şagirdim olarnı oxudubdur.

Qəraqçı lap tökədür qan qəra içində kişün,
Qılıc qılıcğa urar qan tökəndə göz qaqişun.

Mordəmo kuye-to şod mənzeləm, ey hursereşt,
Koşteye-eşq bəli mirəvəd axər be beheşt.

Cəhan, ke vos'əte-u səd hezar fərsəng əst,
Be pişe-çeşme-cəhanbine-hemmətəm təng əst.

Çequne del nəkeşəd canebe-Erağ məra,
Ke əz Erağ be suye-Hecaz ahəng əst.

## 9. ❁ NİZAM ŞAH [SİPEHRİ] | نظام شاه [سپهری] ❁

Xoşsöhbət və səxavət sahibi olan bir padşahdır. Hind padşahlarından heç kim onun kimi iraqsevər və moqolpərəst olmayıb. Bu səbəbdən də bu tərəfdən gedən istedad sahibləri ona pənah aparırlar. Əlbəttə, əgər tale onların üzünü Humayun Hindinə tərəf çevirərsə. Təxəllüsü ***Sipehri***dir. Aşağıdakı mətlə və məqtəni çox yaxşı deyib:

Xalət Xəlilo çehre qolestane-atəş əst
Xətət siyahei ke be damane-atəş əst

Pişe-roxe-to dide **Sepehri** be həm nəzəd,
Atəşpərəst bin ke, çe heyrane-atəş əst.

## 10. ❀ CƏMŞİD XAN* جمشيد خان ❀

Pis padşah deyildi. Onun haqqında bunu demək kifayədir ki, öz həməsri olan hökmdarlar kimi əsası olmayan şöhrətə sahib olmayıb. Rəvan təbi var idi və bu beytlər onundur:

*Beytlər*:

Bivəfai nəhayəti darəd,
Cour kəm kon ke qayəti darəd.

Tond məqzar, keşide dar enan,
Dərdməndi hekayəti darəd.

Bariktər ze must miyane-neqare-mən.
Yek mu qosur nist dər əndame-yare-mən.

Anan ke ba xədənge-cəfaye-to xu konənd.
Tiri nəxorde tire-degər arezu konənd.

## 11. ❀ QAZİ GƏRAY XAN** غازى گراى خان ❀

Çingiz xan zamanından bu gunə qədər şahlıq taxtına belə bir cavan əyləşməyib. Həqiqətən, onun kimi kamal sahibi olan bir kimsəni heç kəs görməyib. Qızılbaş ordusuyla əsir-yesir olduğu bir vaxtda Rüstəmi-dastan və Sami-Nəriman kimi göstərdiyi qəhrəmanlıqlarının şərhə və izaha ehtiyacı yoxdur. Himmət və səxavətdə Hatəm onun şagirdi belə ola bilməz. Musiqi elmini yaxşı bilir və müxtəlif alətlərdə çalmağı bacarır. Qələm illərlə yazsa belə onun vəsfini sona çatdıra bilməz. Qala həbsindən sonra layiqi olmadığı mənsəblərdənsə yenidən həbsə qayıtmağa razı olması haqqında bu rübaini yaxşı deyib:

---

* İshaqiyyə sülaləsindən olan Mahmud xanın oğludur. Karkiya Xan Əhməd padşah devrildikdən sonra 975-ci ildə I Şah Təhmasib tərəfindən Gilan taxtına çıxarıldı və 991-ci ildə öldürüldü.

** Krım hökmlarlarından olan I Gərayın oğludur. Hakimiyyət illəri h.996-1002 və 1002-1017.



*Rübai*:

Ta bude qəmo şadiye-herman bude.
Zin qune qozəşte ta ke douran bude.
Ma təcrobe kərdim ke dər molke-şoma,
Rahət həme dər qəl'e vo zendan bude.

## 12. ❀ MƏHƏMMƏDİ XAN LOR* محمدى خان لر ❀

Yaraşıqlı və böyük himmət sahibi idi. Hamı o padşahın qayğısından bəhrələnirdi. Xüsusən də istedad sahibləri. Mərhum şahın məngənəsindən qaçması onun şücaətinə dəlildir. Bütün bunlarla yanaşı şeir də deyir:

Qətreye-əşki ke dər çeşme-nəminəm mande bud,
Rixtəm dər paye-an delbər həminəm mande bud.

---

* Bəni Xurşid sülaləsindən olan Cahangirin oğludur. Kiçik Lorestanın atabəyi idi. Paytaxtları Xürrəmabad idi və axırda Səfəvilərə qatıldılar. Cahangir h.949-cu ildə I Şah Təhmasibin əmri ilə edam edildi. Oğlu Məhəmmədi xan II Şah İsmayılın vəfatından sonra III Sultan Murada tabe oldu. Bəzi mənbələrdə Məhəmmədi xan Kürd kimi təqdim edilir.



*Sadiq bəy Əfşarın «**Qara ulağa minmiş dərviş**» əsəri. Parisdə mühafizə olunur.*





## *İkinci məcmə*

### *...Şahzadələr haqqında...*



## 13. BƏHRAM MİRZƏ* بهرام میرزا

Tayı-bərabəri olmayan, hər sözü ürəyə xoş gələn, sözü şirin, şeiri rəngarəng, dediyinin yerin bilən, hər kəlmədə məna güdən, şeiri sevən, şairə qiymət verən bir mirzə idi. Sanki mirzəlik o şahzadənin adına yazılmış ayə və ya şahzadəlik o mirzəinin isminə sancılmış bir bayraq idi. Bir çox bilik və hünər sahibini himayə edib onları öz yaxınları və həmtayları yanında fərqli və başıuca etdi. Şeir təbi çox incədir. Aşağıdakı rübaini öz qürurunun tənqidi haqqında çox gözəl deyib:

*Rübai*:

**Bəhram**, dər in səraçeye-por şər o şur,
Ta key be həyate-xoş başi məğrur.
Kərdəst dər in badiye səyyade-əcəl,
Dər hər qədəmi hezar Bəhram be gur.

*Beyt*:

Kuhkən dər eşqbazi can be təlxi dado çərx,
Şəkkəre-Şirin be kame-Xosrove-Pərviz kərd.

Hasele-xod gərçe omri bər səre-del kərdeəm,
Qeyre-dərde-del nemidanəm çe hasel kərdeəm.

## 14. ALXAS MİRZƏ** القاص میرزا

Kəramət və səxavət sahibi, qaynar təbiəti və döyüşkən ruhu olan bir şahzadə idi. İnadkarlığı və mənsəbpərəstliyi ucbatından Ruma getdi və Sultan Süleyman Xondgardan (№ 6) qoşun alıb mərhum şaha (I Şah Təhmasibə) hücum etdi. Bəxti gətirməyib

* Şah İsmayılın oğlu və I Şah Təhmasibin qardaşıdır. H.936-cı ildə 33 yaşında vəfat edib.
** Şah İsmayılın oğlu və I Şah Təhmasibin qardaşı olub. H.922-də doğulub və 956-cı ildə öldürülüb.

əsir düşdü və Qəhqəhə qalasında vəfat etdi. Yaxşı şeir təbi var idi. Aşağıdakı rübaisi məşhurdur:

*Rübai*:

Çon şire-dərənde dər şekarim həme,
Ba nəfso həvaye-xiş yarim həme.
Çon pərde ze ruye-karha bər darənd,
Məlum şəvəd ke dər çe karim həme.

## 15. SAM MİRZƏ* سام میرزا

Bu şahzadə də mərhum şahın (I Şah Təhmasib, № 1) kiçik qardaşı idi. Eyş-işrəti sevirdi. Bir neçə il Xorasan vilayətinə hakimlik edib. Müxtəlif nəzm və nəsr növlərində şux və möhkəm təbi olub. ***Töhfeyi-Sami*** adlı bir şairlər təzkirəsi yazdı. Axırda Şeyx Səfiəddin məqbərəsinə çəkilib şairliklə məşğul oldu. Bu rübai o şahzadədəndir:

*Rübai*:

Hər qah ke eşvei an delaviz konəd,
Aşeq ze bəla çequne pərhiz konəd.
Bad əst nəsihəte-kəsan dər quşəm.
Əmma badi ke atəşəm tiz konəd.

## 16. SULTAN İBRAHİM MİRZƏ [CAHİ]** سلطان ابراهیم میرزا [جاهی]

Bəhram Mirzənin (№ 13) övladlarının başıdır. Söhbətcil, istetdadlı, dərrakəli, lətifəsevər bir şəxs idi. Haqqında qeyri-adi rəvayətlər yayılıb. Çox az hünər və sənət sahəsi olar ki, o həzrət onun elmi və ya əməli tərəfindən faydalanmamış olsun. Lətifə deməyə elə meyilli idi ki, o səbəbdən xalq arasında məsələ çevrilmişdi. Dilini saxlaya bilmədiyindən II Şah İsmayıl (№ 3) dövründə qətlə yetirildi. Təxəllüsü ***Cahi*** idi. Yaxşı beytləri çoxdur. Bu beytləri sevgilisinin göz ağrısı haqqında çox münasib deyib:

* Doğulub: h.923, həlak olub h.975

** II Şah İsmayıl tərəfindən başqa Səfəvi şahzadələri ilə birlikdə h.984-cü ildə qətlə yetirilib.



*Beyt*:

Şenidəm ke, çeşme-to darəd gəzəndi.
Həmana ke oftade bər dərdməndi.

Be çeşmət əsər kərde xune-şəhidan,
Koca kərdei ta neqah keşəndi.

Çera bəsteye-nərgese-natəvanra,
Ke bimar hacət nədarəd bebəndi.

Hərzeqərdi bud Məcnun səxt cani kuhkən,
Rəsmo aine-məhəbbət dər cəhan ***Cahi*** qozaşt.

Yazdığı bu rübai çox məşhurdur:

*Rübai*:

Çon şiveye-ust qəsde-***Cahi*** kərdən,
Hər dəm setəmi be biqonahi kərdən,
Mən dər əcəbəm əz in ke an səngindel,
Gər can tələbəd, dela, çe xahi kərdən.

## 17. SULTAN HƏSƏN MİRZƏ سلطان حسن میرزا

Şah Abbas Bahadur xanın böyük qardaşı idi. Yaraşıqlı surəti və hamıya bəlli səxavəti olan bir şahzadə idi. Şahzadələr II Şah İsmayılın (№ 3) qəzəbinə düçar olub qətlə yetirildikləri vaxt o da kənarda qalmadı.* Lakin qətl vaxtı çox böyük mərdanəlik göstərdi. Yumşaq şeir təbi var idi. Aşağıdakı rübai onundur.

*Rübai*:

Ruyət ke ze bade lale miruyəd əz u.
Vəz tabe-şərab jale miruyəd əz u.

* H.984

Dəsti ke piyalei ze dəste-to gereft,
Gər xak şəvəd piyale miruyəd əz u.

## 18. MƏHƏMMƏD İBRAHİM XAN [RƏHİMİ]*

محمد ابراهیم خان [رحیمی]

Urgənc (اورگنج) padşahı Hacım xanın (حاجم) oğludur. Deyirlər rəssamlıq və nəqqaşlıqda bacarığı var imiş. Dütarda (simli musiqi aləti) yaşıdlarından irəlidə imiş. Şeiri də belədir:

*Şeir:*

Səhər ke rixt səd qohər səhne-bustan şəbnəm,
Morəsse gəşt came-laleye-sədbərg əz an şəbnəm.

Ze mojqan abe-çeşməm pişe-ruyət duşəd ari,
Be pişe-aftab əz səbze migərdəd nehan şəbnəm.

Qole-sədbərg çon came-şərab ərğəvani şod,
Hobab çənd şod ba an şərab ərğəvan şəbnəm.

Nəxahəd mand əz bade-xəzan qolha əgər başəd,
Be fərğəş mixhaye-ahənin, ey bağban, şəbnəm.

Nevisəd ta dər ousafe-roxət şe're-***Rəhimira***,
Əz an ru kərde dəftərhaye-qolra zərfeşan şəbnəm.

## 19. BƏDİ ƏZ-ZƏMAN MİRZƏ** بدیع الزمان میرزا

Bu şahzadə də mərhum Bəhram Mirzənin (№ 13) oğludur. Ağıl-dərrakə, səxavət və kəramət sahibi idi və illərlə Sistanda hakimlik edib. Təbində böyük şuxluq var. Aşağıdakı beytləri məhbubunun qəzəbli rəftarı müqabilində çox gözəl deyib:

* ***Çap nüsxəsi***ndə yoxdur.
** Bu şahzadə də II Şah İsmayılın əmri ilə h.984-də Sistanda qətlə yetirilib.



*Nəzm:*

Tərəfe-ğolle be naz şekəstən negəh konid.
An ahuvane didəno costən negəh konid.

*An tərze-taziyane keşidən be bad pa,*
*Vəz kəf enan xəlq qosəstən negəh konid.*

*Məst amədən be rəğme-**Bədii** ze bəzme-qeyr,*
*Bordən be tiğ dəsto neşəstən negəh konid.**

## 20. SULTAN MUSTAFA MİRZƏ** سلطان مصطفی میرزا

Mərhum şahın (I Şah Təhmasib, № 1) əziz övladı idi. «Şah-surət və məna» adı ona layiq, «günəş hüsnlü və camallı» təşbihi ona düzgün verilmişdi. Kiprikləri ürəyə sancılır, gülüşü qəlbə vəlvələ salırdı. Təbi çox incə və aşiqanədir. Bu beytlər onundur:

*Beyt:*

Ey del, qəm aşenaye-to şod, tərke-u məkon,
Hər ruz be yeki nətəvan aşena şodən.

Ey sərv, fekəndi be sərəş saye, nəqofti,
Nazok bədəni çon keşəd in bare-geranra.

Dadeəm can ke be dəst amədе damane-qəməş,
Vəqt yarist, dela, cane-tovo cane-qəməş.

* Sonuncu iki beyt ***çap***dan götürüldü
** Atası ölən vaxt bu şahzadənin iyirmi yaşı var idi və II Şah İsmayılın əmri ilə qətlə yetirilib.



*Sadiq bəy Əfşarın* ***«Ağac altında oturmuş dərviş»*** *əsəri.*
*Tehranda mühafizə olunur.*





## *Üçüncü məcmə*

## ***...Səltənət sütunu olan türklər haqqında...***

## 21. ❁ MÜSƏYYİB XAN [TƏKƏLU]* [مسيب خان [تکلو ❁

Herat bəylərbəyi Məhəmməd xan Şərəfəddin oğlunun övladıdır. Olduqca təvazökar və ləyaqətli bir gəncdir. Qızılbaş dövlətinin şəxsiyyətləri arasında öz fitri istedadına görə ona bərabəri çox az tapılar. Musiqi elmində çox mahir idi. Əsərləri məşhurdur. Hər növ şeir yazıb. Nəstəliqdə gözəl xətti var. Aşağıdakı rübaisi məşhurdur:

***Rübai:***

Boqzəşt bərabəro gereh əz kin zəde.
Ba zolf ço zonnar rəhe-din zəde.
Əz yek negəhe-çeşme-siyahəş fil-hal,
Oftad deləm ço morğe-şahin zəde.

Bu beytləri də pis deməyib:

***Beytlər:***

Ze duriyət şəbo ruzəm be aho nale qozəşt,
Do ruze hecre-to bər mən hezar sale qozəşt.

Təlxiye-mohnəte-yekruzevo sədsale yekist,
Mikoşəd zəhr əgər əndək əgər besyar əst.

Nəsuzəd yade-duzəx yade-hecrane-to misuzəd,
Qiyase-atəşe-hecran əz inca mitəvan kərd.

Xar gəştəst be çeşməm moje şəbha bi to,
Qol dorude deləm əz əşke-təmənna bi to.
Əsəre-hosne-to nazəm ke şəhidane-tora,
Nətəvanəd ke konəd zende Məsiha bi to.

---

* H.992-ci ilə qədər Rey hakimi olub.

## 22. ❀ MURAD XAN [FİQARİ] مراد خان [فقاری] ❀

Təmər xanın* oğludur. Əvvəllərdə mərhum şahın nəzəri altında idi. Bəzi namünasib əməllər nəticəsində o səadət şərəfindən məhrum oldu. Çox gənc və güclü bir cavan idi. Bu səbəbdən də çox qəribə bir göz xəstəliyinə düçar oldu. Ümid var ki, daxili aləmi sevinc nuru ilə işıqlansın. Təbi şeirin hər növündə yaxşıdır. Təxəllüsü *Fiqari*dir. Aşağıdakı beyt onundur:

*Beyt:*

Mən məstəm əz nəzzareye-to sağər dəhi be naz,
Bitabiyi ke sər zənəd əz mən qonah nist.

Aşağıdakı türkcə beytləri pis deyil:

*Beyt:*

Təkəllüm vaxtı açdı qönçə ağzın ləli-dürbarı,
Təbəssüm birlə can aldı, yenə can verdi güftarı.

Hər qətreyi-qan kim tökülür çeşmi-tərimdən,
Qəmmazım irir, düşdü bu yüzdən nəzərimdən.

Baş çıxarmış çaki-pəhludən könül nəzzarinə,
Dostum gör kim nə düşmən çıxdı yanımdan bənim.

Bu rübaini də dərvişanə deyib:

*Rübai:*

An rahrəvane-biqədəmra eşq əst,
Sahebnəfəsane-zendedəmra eşq əst.
Hatəmsefətane-biderəmra eşq əst,
Matəmzədeqane-biələmra eşq əst.

* Sistan hakimi olub.



## 23. ❀ MƏHƏMMƏD ƏMİN SULTAN* محمد امین سلطان ❀

Turkəmandır. Anası tərəfdən mərhum II Şah İsmayıla (№ 3) qohumluğu çatır. Bu cür əsil-nəcabəti ilə bərabər xoş rəftarı da olan başqa bir gənc tapmaq mümkün deyil. Himmət və şücaəti də var. Fars və türk şeirini yaxşı oxuyur və yaxşı da bilir. İstəsə belə şeir də yazar:

*Beyt:*

Nəşekoft del dər sineəm əz bade-damane-kəsi,
Ta çənd başəd əxgəri dər zire-xakestər nehan.

## 24. ❀ ŞAHVERDİ XAN [QÜYURİ] شاهوردی خان [غیوری] ❀

**Çəmdanoğlu** çılğın bir aşiq, nəcib və fədakar bir insandır. Təsəvvüflə arası çox yaxşıdır. Təxəllüsü *Qüyuri*dir. Təxəllüsü ilə rəftarı bir-birinə çox uyğundur. Həqiqətən çox yaxşı gəncdir. Aşağıdakı beytlər onundur:

*Qəzəl:*

Ey dərdo qəme-to bər dele-mən,
Eşqət ze do koun hasele-mən.

Ruh əl-qods əst dər şəbe-vəsl,
Pərvaneye-şəme-məhfəle-mən.

Sər mibarəd ze əbre-tiğəş,
İnəst neşane-qatele-mən.

Bər xiz ze pəhluyəm, *Qüyuri*,
Misuzi əz atəşe-dele-mən.

* Şah Təhmasibin qızı Xədicə bəyimin oğludur. Atası Cəmşid xan (№ 10) olub. Xan Əhməd padşahla (№ 4) birlikdə Şirvan yolu ilə Osmanlıya pənah apararkən yolüstü Gəncədə xəstəlikdən vəfat edib və orada dəfn olunub.

